UOT 636.06

# ABŞERON QOYUN CİNSİNİN BƏZİ DAMAZLIQ VƏ MƏHSULDARLIQ KEYFİYYƏT GÖSTƏRİCİLƏRİ

**Ş.M.MƏMMƏDOV**
**Abşeron Heyvandarlıq Təcrübə Stansiyası**

*Məqalədə " Abşeron" qoyun cinsinin yaradılması tarixi, sürünün sinif tərkibi, istehsalata tətbiqi, təsərrüfat və yaş-cinsiyyət qruplarında yun məhsuldarlığı, il boyu ekstremal otlaq-örüş şəraitində yüksək məhsul verməsi, onun bölgələrdə geniş yayılması, tövsiyə edilmişdir.*

***Açar sözlər:** Abşeron qoyun cinsi, seleksiya-damazlıq, bonitirovka,sinif tərkibi, yunməhsuldarlığı.*

Bazar iqtisadiyyatı şəraitində müstəqil Respublikamızın əhalisinin ət və süd məhsullarına olan tələbatının ödənilməsində qoyunçuluq aparıcı sahə olmaqla mühüm yerlərdən birini tutur. Bunun inkişafı üçün ən vacib tədbirlərdən qoyunçuluqda yerli genefondların seleksiya damazliq işini bu günün tələbi səviyyəsində qurmaqla, yerli iqlim otlaq-örüş şəraitinə dözümlü, bu şəraitdən maksimum istifadə edə bilən, xəstəliklərə davamlı, perspektivli qoyun cinslərinin təkmilləşdirilməsi istiqamətində aparılmalıdır. Məhsuldarlığın artırılması və keyfiyyətinin yüksəldilməsi istiqamətində tədqiqatlar genişləndirilməlidir. Abşeron bölgəsinin özunə məxsus müxtəlif yem ehtiyatlarından daha səmərəli istifadə etməklə ən ucuz və keyfiyyətli ət, sud, yun verməsi, bu şəraitdədoğub törəməsi ilə Şirvan və Qala qoyun cinsləri daha çox diqqəti cəlb etmişdir. Yerli qabayunlu Şirvan qoyunlarının yun məhsuldarlığını artirmaq və keyfiyyətini yaxşılaşdırmaq məqsədi ilə 1956-cı ildən başlayaraq bölgəyə zərifyunlu merinoc, prekoz cinslər gətirilmiş və kutləvi olaraq qandoydurma istiqamətində çarpazlaşdırılması aparılmışdır. Bu istiqamətdə çarpazlaşdırma Abşeronun spesifik, ekstremal təbii - otlaq iqlim şəraitində, faktiki olaraq heç bir müsbət nəticə verməmişdir. Əksinə olaraq alinmiş mələzlərdə diri çəki, tezyetişkənlik, bala vermək və s. keyfiyyət göstəriciləri azalmışdır. Bütün bunları nəzərə alaraq Abşeron bölgəsində qoyunçuluğun yarımqaba yunlu, yağlıquyruq, ətlik-yunluq-südlük istiqamətdə inkişaf etdirməyi alimlər qarşıya bir məqsəd kimi qoydular.

1971-ci ildən başlayaraq Qala qoyununun bərpası, çoxaldılması məqsədi ilə təsərrüfatda olan bütün zərif, yarim zərif, yarımqaba yunlu mələz qoyunlarda geriyə çarpazlaşdırma aparılmış, yarımqaba yunlu, yağlıquyruq mələzlər üzərində uzun müddət seleksiya damazlıq işi aparılmaqla , onun bazasinda "Qobu" və "Güzdək" damazliq təsərrüfatları yaradılmışdır. N.Nəcəfovun apardığı çox illik (1971-2010-cu illər) elmi-tədqiqat, seleksiya və damazlıq işlərinin nəticəsi olaraq ekstremal təbii-otlaq şəraitində yüksək məhsul verən, əcdadı məlum olan qoçlardan törəmiş yeni yarımqaba yunlu, yağlıquyruq Abşeron cinsli qoyunun bölgədə böyük massivi və Qobustan, Şurabad, Altıağac qoyunçuluq təsərrüfatlarında qız sürü massivləri yaradılmışdır. Abşeron cinsli qoyunlar bazar iqtisadiyatının tələblərinə tam cavab verdiyi üşün son illərdə geniş yayilması, həm damazlıq təsərrüfatlarından və həmin təsərrüfatlarda işləyən çobanların sürülərindən ıldə mınlərlə qoyunu damazlıq kimi alınıb özəl sürülərdə istifadə edilır. Belə ki, Abşeron, Xızı, Şabran, Xaçmaz, Quba, Qusar, Şamaxi, Qobustan, Hacıqabul və s. rayonların fermer təsərrüfatları alıb öz qoyun sürülərinin cins tərkibinin yaxşılaşdırılmasında istifadə edirlər.Yerli aboriqen qoyun cinsləri gələcəkdə davamlı, məhsuldar cinslərin yaradilmasında istifadə edilə bilər. Yerli qoyun cinslərindən Qarabağ, Şirvan, Bozax, Balbas, Mazex, Ləzgi, Caro, Qala qoyunları perspektivlidirlər. Gələcəkdə bu cinslər üzərində seleksiya damazlıq işləri qurmaqla, məhsuldarlıq və damazlıq keyfiyyəti günün tələbi istiqamətində təkmilləşdirilə bilər. Son illərdə bu sahədə xeyli işlər görülmüşdür. Belə ki, alimlərdən M.Ə. Dəmirov (3.) tərəfindən uzun müddət Qarabağ-Qaradolax cinsinin təkmilləşdirilməsi və onun yarımqaba yunlu, yağlıquyruq "Mil-Qarabağ"qoyun cinsinin yaranması ilə başa çatdırılmışdır. B.E.Ocaqquliyev, N.B.İsmayılov, M.C.Məmmədov, F.M.Ridanova(5) yeni tip ləzgi qoyununu yaradılması, B.E.Ocaqquliyev, N.B.İsmayılov (6) Şəki-Zakatala bölgəsində məhsuldar yarımqaba yunlu ( krosbred) qoyun tipinin yaradılması və s. Işləri qeyd etmək olar. Bütün bunları nəzərə alaraq 1971-ci ildən başlayaraq N.A. Nəcəfov tərəfindən "Qala" qoyununu bərpası, çoxaldılması, məhsuldarlıq və damazlıq keyfiyyətinin yüksəldilməsi istiqamətində fasiləsiz çoxsahəli elmi - tədqidat, seleksiya və damazlıq işi aparılmaqla əjdadı məlum olan törədici qoçlardan alınmış yeni yarımqaba yunlu, yağlıquyruq "Abşeron" cinsli qoyunların genotipinin, bölgədə qız sürü massivləri yaradılmış və təkmilləşdirmək istiqamətində iş davam etdirilmişdir. Tədqi-

qatların nəticəlıri müntəzəm olaraq geniş şəkildə dərc olunmuş, (1,2,3,4,5,6,7,8,9,10,11,12,13,14,15, 16,17,18) əsərlərdə verilmişdir20 iyul 2011-ci il tarixdə seleksiya nailiyyətlərinin sınağı və mühafizəsi üzrə Dövlət Komissiyası yeni yaradılmış " Abşeron" və "Mil-Qarabağ" cinslərini qeydiyyata almış və hər iki cinsin müəlliflərinə müəllifik şəhadətnaməsi və Patent verilmişdir. Bu cinslər yüksək genetik imkana malik olmaqla texnoloji tələbatlara tam cavab verir. Qoyunçuluğu, heyvandarlığın başqa sahələrindən fərqləndirən əsas üstünlüklərindən biri, az yararlı torpaqlardan, qisa boylu örüş yemlərindən, çətinliklə gedilə bilən yabanı otlaq sahələrindən və digər müxtəlif yem bitkilərindən maksimum səmərəli istifadə etməklə, az məsrəflə daha ucuz məhsul-ət, süd, pendir, dəri,xəz və s. əldə etməyin mümkün olmasıdır. Bu sahədə yerli qaba və yarımqaba yunlu cinslər daha üstünlüyə malikdirlər. Aparılmış elmi-tədqiqat işlərin nəticəsində sübut olunmuşdur ki, yağlıquyruq qoyunlar yerli şəraitə yuksək səviyyədə uyğunlaşır və aclığa, yarıtmaz pis qulluq səraitinə qeyri-adi dözümlülüyü ilə fərqlənir.Onlar hər cür ağir şəraitdə özlərinin təsərrüfat əhəmiyyətli, ətlik keyfiyyətini itirmirlər. Yağlıquyruq qoyunların bu müstəsna xüsusiyyətləri onları digər qoyun cinsləri arasinda cox üstün və qiymətli edir. Abşeron rayonunun "Abşeron İstehsalat Müəsisəsi" MMC-nin Qobu və Güzdək, eləcədə Abşeron bölgəsində kəndli fermer təsərrüfatlarında əcdadi məlum olan rekord məhsullu qoçlar genoloji xətt başçısı kimi seçilmiş qoçlardan, onların davametdiricisi olan oğul, qız ( erkək, dişi) törəmələrindən geniş istifadə etməklə yeni "Abşeron"cinsli qoyunların bölgələrdə məhsuldar böyük sürüləri yaradılmışdır.Hazirda təkmilləşdirmə istiqamətində "Damazlıq seleksiya işlərinin əsasları" normativ aktları rəhbər tutularaq tədqiqat işləri təsərrüfatlarda müntəzəm ardıcıllıqla davam etdirilir. Tərəfimizdən aparılan tədqiqat işi Abşeron rayonunun"Abşeron İstehsalat Müəsisəsi" MMC-nin Qobu və Güzdək qoyunçuluq fermalarındaolmaqla 2923 baş təmiz qanlı yarımqaba yunlu , yağlıquyruq abşeron cinsli qoyunu əhatə etmişdir. Aşağıdakı tədqiqat işləri aparılmışdır; - Damazlıq təsərrufatda Abşeron cinsli qoyunda seleksiya – damazlıq işləri 2016-2020 –cı illər üçün işlənmiş və təsdiq edilmiş metodikaya və iş planına uyğun olaraq aparılmışdır; - Sistematik olaraq hər il yaz qırxımından əvvəl qoca, az məhsuldar, tələbata cavab verməyən ana qoyun və törədici qoçlar çıxdaş edilib cavan məhsuldar qoçlarla əvəz edilmişdir;

- Perspektivli seleksiya damazlıq planda sürülər arası qoç dəyişdirilməsi sxeminə daim nəzarət edilir;

- Ana qoyun və əsas törədici qoçlar sürülüşə hazırlanmış, ana qoyun sürüləri fermalaşdırılmış, sürülərə damazlıq qoçlar sərbəst cütləşmədə 1:20 və 1:25 nisbətində təhkim edilmişdir; - Yun məhsuldarlığı yaş və cinsiyyət qruplarında fərdi yunlar 0.1 kq dəqiqliyində çəkilməklə müəyyən edilmiş, toplanmış ilkin materiallar biometrik işlənmişdir. Abşeron rayonunun"Abşeron İstehsalat Müəsisəsi" MMC-nin Qobu və Güzdək qoyunçuluq fermalarıAbşeron cinsli qoyun üzrə ixtisaslaşdırılmışdir. Qoyunlar bütün il boyu otlaq-örüş şəraitində saxlanılır. Qarlıçovğunlu gunlərdə quraq lıq nəticəsində otlaqda, örüşdə ot olmadıqda əlavə qüvvəli , qabavə s. yemlərə ehtiyac olur. Abşeron cinsli qoyunlarda cinsin bonitrə təlimatına əsasən Qobu və Güzdək qoyunçuluq fermalarında bonitirovka aparılmışdır. Cinsin keyfiyyətini qiymətləndirərkən əsas göstərici sürüdə damazlıq heyvanların (elit və 1-cisinif) miqdarının çox olması ilə ölçülür. Sürüdə damazlıq heyvanların xüsusı çəkisi 50% -dən nə qədər çox olsa, bir o qədər proqressiv sayılır. Az olarsa reqressiv adlanir. Abşeron cinsli qoyunları qiymətləndirdikdə aydın olur ki, bu cinsin Abşeron bölgəsində inkişaf etdirilməsi məqsədə uyğundur.

**Cədvəl 1**

**Hesbat ilində qoyunların bonitirovkasinin nəticəsi aşağıdakı kimi olmuşdur.**

| Yaş və cinsiyyət qrupları | ölçü vahidi | cəmibonitirə olub | cumlədən siniflər | | | sinifin cəmi | sinifdən kənar |
|---|---|---|---|---|---|---|---|
| | | | elit | I sinif | II sinif | | |
| 1 | 2 | 3 | 4 | 5 | 6 | 7 | 8 |
| Əsas törədici qoçlar | baş | 101 | 63 | 19 | - | 83 | 18 |
| | % | 100 | 62,4 | 19,8 | - | 82,2 | 17,8 |
| Ana qoyunlar | baş | 1550 | 606 | 346 | 276 | 1228 | 322 |
| | % | 100 | 39,1 | 22,3 | 17,8 | 79.2 | 20,8 |
| Bir yaşdan yuxarı şişəklər | baş | 345 | 164 | 96 | 40 | 300 | 45 |
| | % | 100 | 47,6 | 27,8 | 11,6 | 87,0 | 13,0 |
| Bir yaşdan yuxarı erkəklər | baş | 358 | 187 | 117 | - | 306 | 52 |
| | % | 100 | 52,3 | 32,7 | - | 85,5 | 14,5 |
| **Cəmi** | **baş** | **2354** | **1023** | **578** | **316** | **1917** | **437** |
| | **%** | **100** | **43,5** | **24,6** | **13,4** | **81,5** | **18,5** |

1-ci cədvəldən aydın olur ki, 2354 baş qoyun bonitirə edilmiş, sinif almış qoyunlar 1917 baş, 81,5 faiz , arzu edilən elit və I sinif qoyunlar 1601 baş 68,1 faiz olmuşdur

Quzular ilk dəfə 5-6 aylığında yazda qoyunlarla bir vaxtda qırxılır. Cavanlar ilk dəfə bonitrə edilən vaxt onların illik yun məhsulu kimi hesaba (uçota) alınmaqla qiymətləndirilir. "Abşeron" cinsli qoyunların cinsiyyət və yaş qrupları üzrə yunlar çəkilməklə alınmış ilkin materiallar biometrik işlənmişdir. Yun məhsuldarlığının nəticələri qoyunların cisiyyət və yaş qrupları üzrə işlənməsi aşağıdakı cədvəldə verilmişdir (kq.-la).cədvəl 2.

2-ci cədvəldə damazlıq törədici qoçların orta hesabla yun məhsuldarlığı 4,10 ± 0,083, ana

qoyunlarda 2,81 ± 0,050, şişəklərdə 3,17 ± 0,085, təmir erkək toxlularda 3,51 ± 0,077 kq. olmuşdur.

| Yaş cinsiyyət qrupu | n | M ± m | lim | | C |
|---|---|---|---|---|---|
| 1 | 2 | 3 | 4 | 5 | 6 |
| Törədici qoçlar | 57 | 4,10 ± 0,083 | 2,9 - 5,5 | 0,652 | 17,44 |
| Ana qoyunlar | 106 | 2,81 ± 0,050 | 2,0 - 4,4 | 0,524 | 18,64 |
| Təmir şişəklər | 49 | 3,17 ± 0,085 | 2,3 - 4,6 | 0,615 | 19,35 |
| Təmir erkəklər | 63 | 3,51 ± 0,077 | 2,3 - 5,5 | 0,614 | 17,44 |

Yun məhsuldarlığının dəyişkənlik əmsalı (C) qoçlarda 17,44%, ana qoyunlarda 18,64%, şişəklərdə 19,35%, təmir erkək toxlularda 17,44% olması bir daha təsdiq edir ki, yun məhsuldarlığını gələcəkdə artırmaq üçün Abşeron" cinsli qoyunların böyük potensial imkanı var. Bu imkanları üzə çıxarmaq üçün yüksək yemləmə, bəsləmə,saxlama şəraiti ilə yanaşı seleksiya damazlıq işləri də genişləndirilməlidir.

**ƏDƏBİYYAT**

**1. Nəcəfov N.A.** – Qala qoyununun bəzi bioloji-təsərrüfat xüsusiyyətləri. //Kənd təsərrüfatı elmı xəbərləri. Jur. - 1974 il - №. 06. - səh.55-58. **2. Наджафов. Н.А**. – Пути восстановления размножения овец Гала гоюну. //Тезис докладов ВАСХИНИЛ г.Кировабад. - 1975 г.- стр.46-48 **3**. **Nəcəfov N.A.** - Qala – Abşeron qoyunu// " Azərbaycan fermerləri" jurn.- 1997 il. - № 3. - səh23.. **4.Nəcəfov N.A.** - Potensial imkanlı yarımqaba yunlu Qala-Abşeron cinsli qoyun.// "Azərb. Aqrar Elmi" j. - 1995-il. - №3-6. - Səh.23--24.**5.Nəcəfov N.A.** - Abşeron cinsli qoyunun seleksiya - damazlıq işləri və bəzi məhsuldarlıq göstəriciləri. //Az.ETHİ-nin əsərləri toplusu. -Bakı 2004-il -.səh.145-149. **6.Nəcəfov N.A.** - Perspektivli Abşeron qoyun cinsi yaradılmışdır. //Azərbaycan elmi beynəlxalq elmi nəzəri jurnal.- Bakı 2005-.№ 6-7.-səh.10-23. **7.Nəcəfov N.A.** - Abşeronda Qala qoyunun bəzi məhsuldarlıq göstəriciləri //Elmi əsərlərin tematik məcmuəsi. - Bakı 1979 il. -16 cild. - səh.92-100. **8. Наджафов. Н.А.** - Перспективы восстановления, размножения и совершенствования продуктивных качеств овец Гала гоюну вусловияхАбшерона.// Тезисы докладов республиканского совещания продуктивности с/х Азербайджана.- Баку 1980 г. **9. Наджафов. Н.А.** – Временная инструкция по бонитировке жирно- хвостных овец Гала гоюну.// Дополнено и утверждено плем. Совета СХ Азерб.ССР от 23.02.1978 г. **10. Nəcəfov N.A.**- Abşeron zonasında müxtəlif cins və cins qruplarının, onlarin mələzlərinin yun məhsulunun müqaisəli öyrənilməsinin bəzi göstəriciləri, kənd təsərrüfatı heyvanlarının məhsuldarlığı, keyfiyyətinin təkmilləşdirilməsi yolları.// Az.ETHİ-nin əsərlərinin tematik məcmuəsi. Bakı 1983-il.səh.20 – 94. **11. Nəcəfov N.A.**-Yeni yaradilan yarimqaba yunlu Qala-Abşeron qoyunun yununun bəzi laboratoriya keyfiyyət göstəriciləri.// – Azərb. Aqrar elmi. Jur. 1991 il.- № 5. - səh. 16-17. **12. Nəcəfov N.A.** -Qala - Abşeron qoyunların bonitirəsinə zootexniki tələbata dair təlimat./ - Bakı 1994 il. **13. Nəcəfov N.A.** Qala - Abşeron qoyun populyasiyasının genetik göstəriciləri. //– Azərb. Aqrar elmi. Jur. 1994 il.-№4.- səh 10-11. **14.Nəcəfov N.A.** - Azərbaycan şəraitində Qala – Abşeron cinsinin reproduktor genefondunun yaradılması.// Azərb.SSR. Aqrar sənaye komitəsinin istehsalat tətbiqi üçün təklif etdikləri işlərin qısa xülasəsi.- Bakı 1987 il.- səh. 100-101. **15.Nəcəfov N.A.** - Qala - Abşeron qoyunun K/T istehsalı və elmi sənayesi müəsisələri üçün işlənib hazırlanmış 1989-1990 - cı illərin istehsalat tətbiqi tövsiyyə edilmiş.//- elmi – tədqiqat və təcrübə konstruktor işlərin qısa xülasəsi. - Bakı 1989 il.- səh.141-142. **16. Nəcəfov N.A.** - Abşeron qoyun cinsinin əsas bioloji – təsərrüfat və damazlıq məhsuldarlıq göstəriciləri. / E. Bəşirov Azərb.-da damazlıq heyvanların problemləri və inkişafının elmi əsasları (1951-2008-il.)/ - Bakı 2008il. səh.459-476. **17.Nəcəfov N.A.** - Abşeron qoyun cinsi .// Elm və həyat jur. - 2010 il.-№1. - səh.58-59. **18. Nəcəfov N.A. –** Azərbaycanda Abşeron qoyun cinsi yaradılmışdır.// Azərb. Aqrar elmi. Jur. - 2010 il.- №5.- səh 59-60.

**Некоторые племенные и продуктивные качественные показатели Апшеронской породы овец.**

**Ш.М.Мамедов**

В племенных овцеводческих хозяйствах «Гюздек и Гобу» Апшеронского района в хозяйственных экстремальных – суровых пастбищных условиях в результате проведенных научных и селекционных работ за период 1971-2010 гг. создана устойчивая, высокопродуктивная, жирнохвостая , полугрубошерстная порода овец «Апшеронская».

***Ключевые слова:*** *Апшеронская порода овец, племенная, бонитировка, шерстная продуктивность.*

**Some pedigree and productive quality factors of Absheron sheep strain.**

**Sh. M. Mammadov**

Steady, high productive , fat-tailed, semi coarse–haired pedigree of "Absheron" sheep was created in pledge sheep agriculture "Guzdek" and "Qobu" of Absheronregion in agricultural extreme-severe pasurableconditions as theresult of implemented scientific and selective works durinq the 1971-2010. It was breed and abopted as the grade up of lokal sheep strains in 1985-2010.

***Key words:*** *Absheronsheep strain, pedigree, bonitation, wooly productivity.*